


Düzaxınlı siyirtmələrin konstruksiyasını dəyişməklə onun tıxayıcı düyününün işçi səthlərində nisbi təzyiqin bərabər paylanmasının təmin edilməsidir.
Siyirtməni konstruktiv həll edərək sipərin açılıb-bağlanması və şpindelin çıxışa hərəkətsizliyini təmin etmiş oluruq. Konstruksiyanın gediş qaykası T şəklində pazla sipərə birləşdirilir. Yəhər gövdənin yuvasında oturdulur. Şpindel isə öz növbəsində iki dayaq yastığı üzərində oturdulur. Konstruksiyada hazırlanmış nazimçarx tez sökülür. Nazimçarx vasitəsilə şpindelə ötürülən firlanma həyata keçirilir.
Təklif olunmuş [3] siyirtməsində tıxayıcı düyün dəyişdirilib və düyünə üzük də əlavə edilmişdir (Şək 2).



**Şəkil 2.** Hazırlanmış ZMS 65x35 tipli siyirtmənin ümumi görünüşü.

Bu siyirtmə konstruksiyası "NEFTQAZMAŞ ASC"-də sınağa uğradılmış və sınaq nəticəsində tıxayıcı düyündə nisbi təzyiqin bərabər paylanması təmin edilmişdir. Siyirtmənin tıxayıcı düyünündə yaranan nisbi təzyiqin qiymətini onun kipləndirməsinin təmin edilməsində əsas şərt olduğundan bu siyirtmə üçün nisbi təzyiqin hesanını aparaq[4,6].
Siyirtmənin tıxayıcısını təşkil edən şiber (sipər), yəhər, üzük, nimçəvari yay və s. hissələr quyudan çıxarılan mühitin təzyiqi altında işləyir. Bu hissələrin möhkəmliyə və sərtliyə hesabını aparaq. Sipəri çıxış tərəfdəki yəhərə sıxan qüvvə aşağıdakı düsturla təyin edilir

$$Q_{sıx}=\frac{\pi}{4}D_1^2P_i+Q_i+Q_{üzük}+Q_{yay} \quad (1)$$

Burada $Q_{sıx}$ – çıxış tərəfdəki sıxıcı qüvvə; $Q_i$ – elastik kipləşdiricinin sıxıcı qüvvəsi; $Q_{yay}$- nimçəvari yayın elastik qüvvəsi; $Q_{üzük}$- üzüyün elastik qüvvəsi; $D_1$- yəhərin yan səthindəki qanovcuğun orta diametri,mm; $P_i$ – mühitin işçi təzyiqidir, MPa ilə.
Tıxayıcının kipləşdirilən səthlərində mühitin çıxış tərəfində maksimum nisbi təzyiq [1]

$$Q_{sıx}=\frac{4Q_{sıx}}{\pi(D_{2-}^2-D_1^2)} \quad (2)$$

Burada $D_1$, $D_2$-müvafiq olaraq yəhərin xarici və daxili diametridir, mm.

$$q_{sıx}=\frac{\pi D_1^2P_i+4Q_i+4Q_{üzük}+4Q_{yay}}{\pi(D_2^2-D_1^2)} \quad (3)$$

burada $Q_i$-$Q_{üz}$-$Q_{yay}$–ın qiymətləri təcrübə nəticəsində təyin olunur.

Tıxayıcının (yəhər və şiberin) “metal-metal” səthinin kipliyinin təmin olunma və siyirtmənin davamlılıq şərti belədir:

$$q_k \leq q_{sıx} \leq q_s$$

Burada $q_k$ – tıxayıcının səthində, mühitin verilmiş təzyiqində onun kipliyini təmin edən kontakt təzyiqin minimal miqdarıdır; eksperiment yolu ilə müəyyən edilir, MPa; $q_s$- tıxayıcının səthində onun siyirtməyə dayanıqlığını təmin edən kontakt təzyiqin maksimal miqdarıdır; eksperiment yolu ilə müəyyən edilir, MPa; $q_s$= 260MPa.
(3)-hesablamasından məlum olduki,

$$50MPa \leq 150MPa \leq 260MPa.$$

Alınan qiymətlərdən məlum olur ki, yeni siyirtmə üçün kiplik təmin olunur.

**Nəticə:** 1.Yeni siyirtmə konstruksiyası “NEFTQAZMAŞ ASC”-də sınağa uğradılmış və sınaq nəticəsində hazırlanan siyirtmədə təzyiqlərin bərabər paylanması şərtləri tam ödəyir.
2.Yeni siyirtmə konstruksiyasının tıxayıcı düyünündə yaranan nisbi təzyiqin hesablanması üçün emprik ifadə olunmuşdur.
3.Bu emprik ifadəyə əsasən yeni siyirtmənin tıxayıcı düyünündə yaranan nisbi təzyiq təyin edilmişdir.
Alınan qiymət əsasında siyirtmənin davamlılıq şərti yoxlanılmışdır. Yoxlamanın nəticəsi müsbətdir.

## ƏDƏBİYYAT

1. Aslanov C.N. və başqaları, Maşın qurğu və avadanlıqların layihələndirilməsi. Bakı 2020.
2. Асланов Джамаладдин Нураддин, Зейналов Нияз Алимуса Усовершенствование конструкции задвижек высокого давления. Международный центр научного сотрудничества «Наука и просвещение» ЛУЧШАЯ НАУЧНАЯ СТАТЬЯ 2018.сборник статей XVI Международного научно-исследовательского конкурса, состоявшегося 30 апреля 2018 г. в г. Пенза. МЦНС «НАУКА И ПРОСВЕЩЕНИЕ» 2018.,
3. Aslanov J.N. Valve, Useful model. State Standardization Metrology Agency for Patent, №2020 0018.2016
4. Aslanov J.N. Series produced by the shield-saddle bridge valves obstructive structures for improved wear resistance tested in pairs and strategy of the gate valves’ gates. Program methodology .AZİNMAŞ. Baki 2014.
5. Aslanov J.N., Mammadov KH.S. İncreasing improved plug valve’s efficiency. Science, Technology and Higher Education", Canada.2015
6. Aslanov J.N. Best calculation for stress held of sealinsargange ment from rubber-composition materials of wellheard equipment./Aslanov J.N.// Materials of the XII İnternational research and practicl conference. - Germany.:Vela Verlag Waodkcaiburg-Munich , 2015- p.p 31-34.

***Tədqiqat işi Azərbaycan Respublikasının Prezident yanında Elmin İnkişafı Fondunun maliyyə dəstəyi ilə həyata keçirilib - Qrant No EIF-MQM-ETS-2020-1 (35) -08 / 04 /1-M-04***




# IMPROVED VALVE DESIGN SUSTAINABILITY RESEARCH

**[1]Jamaladdin Aslanov, [2]Niyaz Zeynalov**

[1]The head of the department, “Industrial machines” department, Azerbaijan State Oil and Industry University, doctor of technical sciences, Azerbaijan. E-mail: camaladdin.aslanov@asoiu.edu.az

[2]Assistant, “Industrial machines” department, Azerbaijan State Oil and Industry University, dissertant, Azerbaijan. E-mail: niyaz.zeynalov@asoiu.edu.az

## ABSTRACT

The issues of tightness and abrasion resistance of the new design of the ZMS-type valve are considered. An analytical expression was obtained to determine the relative pressure generated across the check valve of the improved valve. Checked the condition of the valve tightness and abrasion resistance. The new valve design was tested at JSCO “NEFTGAZMASH”, and as a result of the tests it was found that the new valve fully complies with these conditions.

**Keywords:** leakage, relative pressure, seal, improved, ZMS, abrasion resistance.




EQUIPMENT, TECHNOLOGIES, MATERIALS

VOLUME 08 ISSUE 04 2021

# FERROMAQNIT ƏSASLI MAYELƏRLƏ BİTUMLU SÜXURLARIN NEFTDƏN TƏMİZLƏNMƏSİ İLƏ BAĞLI TƏCRÜBƏ- SINAQ İŞLƏRİNİN NƏTİCƏLƏRİ

**Təranə Sadıqova**
Assistent, "Sənaye maşınları" kafedrası, Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, Azərbaycan.
E-mail: tarana_sadiqova@mail.ru

## XÜLASƏ

Bitumlu qumların tərkibindəki qalıq neftin ayrılması istiqamətində geniş tərkibli nəzəri tədqiqatlar, elmi-praktiki və müxtəlif xarakterli mühəndis işlərinin aparılmasına baxmayaraq problem öz aktuallığını saxlamaqdadır.
Məqalədə bu məqsədlə fiziki sahələrin təsiri ilə bitumlu qumlardan neftin ayrılması prosesinin təkmilləşdirilməsi məsələsinə baxılmışdır.
**Açar sözlər:** bitumlu qumlar, ferromaqnit əsaslı mayelər, maqnit və elektrik sahələri, neft verimi əmsalı.

**Problemin aktuallığı:** Azərbaycanda təsdiqlənmiş neft ehtiyatı 7,0 mlrd.barrel təşkil edir [1, 2]. Bununla yanaşı ölkədə kifayət qədər tərkibində neftlə zəngin olan bitumlu qum ehtiyatları vardır. Bitumlu qumlar (BQ) yüksək ağır neftlərə aid olub, yüksək sıxlığa və özlülüyə malik olmaqla, daha dərin emal tələb edən alternativ yanacaq mənbəyi hesab olunur [3, 4].
Son illərdə bitumlu qumlardan neftin ayrılmasında geniş tərkibli nəzəri tədqiqatlar, elmi-praktiki və müxtəlif xarakterli mühəndis işlərinin aparılmasına baxmayaraq problem öz aktuallığını saxlamaqdadır.
Neft elminin bu istiqaməti üzrə dünya şöhrətli alimlər-Akinşev İ.M., Anisimov B.V., Anistratov Y.İ., Boqolyubov B.P., Baybakov N.K., Kudinov V.İ., Zakirov S.N., Qoldberq İ.S., Burger J., Gupta S., o cümlədən Azərbaycan neft elmi məktəbinin yeri xüsusi önəm kəsb edir. Akademik A.Mirzəcanzadə, professorlar M.Bağırov, N.Məmmədtağızadə, Q.İsmayılov, S.Sanayev, Ə.Mustafayev, Ş.Məmmədov, A.Əzizov və digərləri bitumlu və neftlə çirklənmiş qumların emalı sahəsində fundamental tədqiqat işləri aparmış, ciddi elmi, elmi-praktiki nəticələr əldə etmişdirlər.
Neft və neft məhsullarının realoji xassələrinə fiziki sahələrin (maqnit, elektrik və s.) təsiri göstərilməklə məhsuldar yataqların verim əmsalının yüksəldilməsi texnologiyası Azərbaycanda akademik A.Mirzəcanzadə məktəbi tərəfindən XX əsrin ikinci yarısından müvəffəqiyyətlə tətbiq olunur [7, 8]. Bu istiqamətdə əsaslı elmi-tədqiqat işləri, neft məhsullarının realoji xassələrinin maqnit mayelərin tətbiqi ilə tənzimlənməsi, [5, 6]. Lakin bitumlu süxurlardan neftin ayrılması işində bu xarakterli elmi-tədqiqat işləri olduqca azdır.
İlkin olaraq FMM-nin hazırlanmasında dispers üsulunun tətbiqi ilə (Fe nano hissəciklərlə) hazırlanmış işçi mayelərdən istifadə etməklə aparılımış sınaqların müzakirəsinə baxaq.

**İşin məqsədi:** Bitumlu süxurların neftdən təmizlənməsi üçün işçi reagentin işlənməsi və sınaqların nəticələrinin müzakirəsi.

**Tədqiqatların metodiki bazası:** İşçi mayenin tərkibi aşağıdakı kimi qəbul olunmuşdur: dispers mühit mədən suyu, ferromaqnit faza qismində ölçüləri 50-100 nm olan dəmir (Fe) nano hissəcik və səth aktiv maddə qismində 5%-lik sulfanol məhlulu. Yüksək səviyyəli dispersliyin təmini ultrasəs qurğusunun köməyi ilə əldə edilmişdir. Maqnit sahəsinin gərginliyinin ölçülməsi üçün Kvazar şirkətinin istehsalı olan universal maqnitometrdən istifadə edilmişdir.

İşçi mayenin hazırlanması şəkil 1-də göstərilən laboratoriya qurğusunda yerinə yetirilmişdir. Eksperimentlərin icrası xüsusi labotatoriya qurğusunda (əsası diamaqnit borudan ibarət olan və daimi maqnitlərlə təchiz olunmuş) aparılmışdır. Burada elektrik maqnitləri ilə yaradılmış elektrik sahəsinin gərginliyi $48 \cdot 10^3$ A/m təşkil etmişdir, onun qiyməti tesloampermetrin köməyi ilə ölçülmüşdür. Eksperimentlərin gedişində sistemdə temperatur daimi saxlanılmışdır, lakin üç müxtəlif rejimdə: T= 20°C, 25°C və 30°C şəraitində aparılmışdır.

Eksperimentlər iki mərhələdə: süxurun neft veriminin maqnit sahəsinin təsiri olmadıqda və olduqda müəyyən olunmuşdur. Bunlardan əvvəl işçi mayenin realoji parametrlərinin tədqiqi aparılmışdır.



**Şəkil 1.** Nanoəsaslı ferromaqnit işçi mayelərin alınması üçün laboratoriya qurğusu.

**İşçi mayenin realoji parametrlərinin tədqiqinin nəticələri:** Alınmış işci mayenin reoloji tədqiqatlarının nəticələri ilə müəyyən edilmişdir ki, qeyri-nyuton xarakterli bu mayelərdə emal prosesinə təsir göstərən amil maqnit effektdir və o maqnitləmə (M, A/m), eləcə də maqnit sahəsinin gərginlik göstəricisi (H, A/m) parametrləri ilə xarakterizə olunur [206, s.424-430]. Tədqiqatlar nəticəsində müəyyən edilmişdir ki, hər iki faktor ferrohissəciklərin ölçü və konsentrasiyasından asılı olaraq dəyişirlər. Bu istiqamətdə aparılmış tədqiqatların nəticələri cədvəl 16-da verilmişdir.

Cədvəl 1-in təhlilindən göründüyü kimi FMM-nin tərkibində maqnit fazasının konsentrasiyasının dəyişməsi maqnit sahəsinin gərginliyi (H) və dinamiki özlülüyə (ν) müxtəlif xarakterli təsir edir. Belə ki, tədqiq olunan işçi maye tərkibində dəmir nanohissəciklərin miqdarının optimal qiyməti 2,85-3,15 sərhədlərinə özünü biruzə verir.

**Cədvəl 1.** Tədqiqatların nəticələri

| İşçi mayenin tərkibində maqnitin həcmi, % | Mayenin sıxlığı, kq/m$^3$ | Dinamiki özlülük,Pa·c | Maqnit doyumu, kA/m |
|---|---|---|---|
| 1 | 925,4 | 0,0022 | 6,77 |
| 2 | 930,3 | 0,0029 | 12,10 |
| 3 | 960,1 | 0,0031 | 14,11 |
| 4 | 965,3 | 0,0027 | 13,96 |
| 5 | 968,7 | 0,0020 | 13,90 |

Bu qiymətlərdən sonrakı artım maqnit sahəsinin gərginliyinin qiymətində stabilləşmənin baş verdiyi müşahidə olunur. Eyni zamanda müəyyən edilmişdir ki, işçi maye tərkibində dəmir nanohissəciklərin miqdarının dəyişməsi nəticəsində (3%-ə qədər) dinamiki özlülük maksimum həddə çatır. Sonrakı artım maqnit sahəsinin gərginlik göstəricisi üçün dəyişməz qaldığı halda, dinamiki özlülüyün azalmasına təsir edir (şək. 2).




**Şəkil 2.** Dəmir nanohissəciklərin miqdarının işçi mayenin maqnit sahəsinin gərginliyi (H) və dinamiki özlülüyə (ν) təsiri.

Şəkil 3-də optimal olaraq qəbul olunmuş kosentrasiyada (3%) metal nano hissəciklərin ölçülərinin işçi mayenin maqnit xarakteristikaları arasındakı asılılıqlar verilmişdir. Alınmış nəticələrin təhlili belə bir mülahizənin irəli sürülməsinə əsas verir ki, nanohissəciklərin ölçülərinin azalması onlarda maqnit xassələrinin yüksəlməsində böyük önəm yaradır. Belə ki, dəmir nanohissəciklərdə ölçülərin 50-100 nm intervalında dəyişməsi maqnitləmə effektinin ortalama 2,5-2,7 dəfə artmasına imkan yaradır. Ən yüksək maqnitləmə dəmir nanohissəciklərin d=50 nm ölçüsünə uyğun gəlir.




**Şəkil 3.** Metal nanohissəciklərin ölçülərinin işçi mayenin maqnit xarakteristikaları arasındakı asılılıqlar: 1-50 nm; 2- 60 nm; 3-80 nm; 4-100 nm;

Şəkil 4-də ultrasəs dalğalarının (USD) təsirinin (tezliyinin) işçi mayedə formalaşan struktura təsirini əks etdirən fotolar göstərilmişdir. Göründüyü kimi USD-nın tezliyinin artması nanohissəciklər arasında aqreqatlaşmaya təsir edərək hissəciklərin kiçilməsinə səbəb olur.




Şəkil 4.Ultrasəs dalğalarının tezliyinin işçi mayedə formalaşan struktura təsiri: a-USD olmadıqda, x 250; b- USD olduqda ($\tau = 20\ hz$), x 500; c- USD olduqda ($\tau = 30\ hz$), x 1000

**FMM əsaslı işçi mayelərin butumlu süxurlardan neftin ayrılması iıə bağlı tədqiqatların nəticələri.** Sonrakı tədqiqatlarda optimal tərkibli və konsentrasiyalı (nanohissəciklərə görə) işçi mayenin bitumlu süxurlardan neftin ayrılma prosesinə təsirinin tətbiqi ilə bağlı təcrübələrin nəticələrinin müzakirəsi verilmişdir.
Şəkil 5-də FMM-in tətbiqi ilə bitumlu süxurların neftin ayrılması ilə bağlı təcrübələrin nəticələri verilmişdir.




**Şəkil 5.** FMM-də nanohissəciklərin konsentrasiyasının bitumlu süxurlarda ayrılan neftin miqdarına təsiri: 1-Maqnit sahəsinin təsiri ilə; 2- Maqnit sahəsinin təsiri olmadan.

Şəkil 5-in təhlilindən göründüyü kimi dəmir nanohissəciklərin konsentrasiyası ilkin mərhələdə (1-3%) yüksəldikcə prosesə müsbət təsir edir, onların sonrakı artımı bitumlu süxurlarda neftin ayrılması prosesinin xarakterinin dəyişməsinə (azalmasına) səbəb olur. Bu maqnit sahəsinin emal prosesində iştirak edən bitumlu süxurun tərkibindəki neftin realogiyasına təsir etməsi ilə izah olunur.
Cədvəl 2 və 3-də müxtəlif xarakterli fiziki sahələrin bitumlu süxurlardan neftin ayrılması prosesinə təsiri ilə bağlı tədqiqat işlərinin nəticələri əks olunmuşdir. İlkin mərhələdə maqnit sahəsinin neftin çıxma əmsalına təsiri, növbətidə elektrik sahəsinin və son olaraq hər iki

sahənin birgə təsiri qiymətləndirilmişdir. Bu nəticələrdən göründüyü kimi prosesdə maqnit sahəsinin iştirakı bitumlu süxurlardan neftin ayrılması prosesinə müsbət təsir göstərir. Maqnit sahəsinin olması bitumlu qumlardan neft çıxarılmasının ortalama 10,2 % artmasına səbəb olur.
Çoxsaylı eksperimental və nəzəri tədqiqatlarla müəyyən olunmuşdur ki, hər hansı bir fiziki sahə sisteminə təsir həmişə bu və ya digər fiziki sahələrin iştirakı ilə müşayiət olunur. Məsələn, maqnit sahələri həm də zəif elektrik sahə mənbələridirlər.
Bununla əlaqədar olaraq, tədqiqat işi elektrik sahəsinin bitumlu qumlara təsirinin öyrənilməsinə yönəldilmişdır. Müəyyən edilmişdir ki, bitumlu qumlardan neft çıxarılmasına elektrik sahəsi müsbət təsir göstərir.
Yuxarıda qeyd olunduğu kimi, maqnit sahələri bu və ya digər dərəcədə elektrik sahələrinin təzahürü ilə müşayiət olunur. Maqnit və elektrik sahələrinin təsiri və həm də onların elektrolitdə dispersləşmiş hissəciyə birgə təsiri tədqiqatları ilə müəyyən olunmuşdur ki, sahələrin birgə öyrənilməsi zamanı hissəciklərin axma xarakteri və sürtünmə müqavimət qüvvələri dəyişir. Həmçinin müəyyən olunmuşdir ki, neft məsullarının hissəciklərinin sahələrin təsiri zamanı ayrılma sürəti, təbii şəraitdə ayrılma sürətindən əhəmiyyətli dərəcədə böyükdür. Bu zaman elektrik və maqnit sahələrinin birgə təsir effekti, hər bir sahənin ayrılıqda götürüldükdə təsir effektindən çox-çox yüksəkdir.
Aşağıda bitumlu qumlardan neft çıxarılmasının qiymətinə maqnit və elektrik sahələrinin birgə təsirinin eksperimental tədqiqatının nəticələri verilmişdir (cədvəl 2).
Bitumlu qumlardan neftin ayrılma həcminin qiymətlərinin təhlili nəticələrindən müəyyən edilmişdir ki, ardıcıllıqdan asılı olaraq birgə təsirin qiymətləri fərqlənir. Ardıcıl maqnitelektrik və elektrikmaqnit emal halında sistemin xassələrinin dəyişilməsində birincilik amili mühüm rol oynayır, ardıcıllıqda ikinci fiziki sahənin təsiri praktiki olaraq yoxdur.

**Cədvəl 2.** Neftin bitumlu qumlardan çıxış qiymətinə maqnit və elektrik sahələrinin ardıcıl təsiri

| Temperatur, °C | Bitumlu süxurlardan nefti ayrılma həcmi, % | | | |
|---|---|---|---|---|
| | Emalsız | Maqnitlə emal ilə | Elektriklə emal ilə | Maqnit və elektrik sahələrinin ardıcıl təsiri ilə |
| 20 | 0,842 | 0,918 | 0,910 | 0,919 |
| 25 | 0,844 | 0,922 | 0,918 | 0,924 |
| 30 | 0,846 | 0,928 | 0,922 | 0,930 |

Cədvəl 3-də maqnit və elektrik sahələrinin sistemə birgə təsirinin nəticələri verilmişdir. Bu nəticələrdən göründüyü kimi, fiziki sahələr birlikdə qoyulduqda ən böyük effekt müşahidə olunur. Belə ki, hər iki sahə bu və ya digər dərəcədə neftçıxarılmasının qiymətinə təsir edirlər. Ardıcıl olaraq, bəzən elektrik və maqnit sahələrinin dispers sistemə cütləşmiş təsirindən güclənmiş effektin də təsiri görünür.




**Cədvəl 3.** Bitumlu süxurlardan neftin ayrılma həcminin maqnit və elektrik sahələrinin birgə təsirindən asılılığı

| Temperatur, °C | Bitumlu süxurlardan nefti ayrılma həcmi, % | |
|---|---|---|
| | Emalsız | Maqnit və elektrik sahələrinin birgə emalından sonra |
| 20 | 0,842 | 0,944 |
| 25 | 0,844 | 0,948 |
| 30 | 0,846 | 0,949 |

Beləliklə, alınmış nəticələri ümumiləşdirərək aşağıdakıları qeyd etmək olar:
- mədən suyu, ölçüləri 50-100 nm olan dəmir (Fe) nano hissəcik və 5%-lik sulfanol məhlulu şəklində hazırlanmış ferromaqnit mayenin tətbiqi bitumlu süxurlardan neftin ayrılmasında əlverişli vasitə kimi qəbul oluna bilər.
- təklif olunan işçi mayedə yüksək səviyyəli dispersliyin təmini məqsədi ilə ultrasəs texnologiyasından istifadə olunması tövsiyə olunur.
- maqnit və elektrik sahələrinin istifadəsi neftin bitumlu qumlardan ayrılmasında çıxış əmsalını böyütməyə imkan verir.

## ƏDƏBİYYAT

1. 1.http://strateq.az/arashdirma/66562/bp-olkələrin-neft-ehtiyatlari-haqda-hesabatini-aciqladi.html BP ölkələrin neft ehtiyatları haqda hesabatını açıqladı
2. http://az.qaynarinfo.az/xeber-azrbaycann-neft-ehtiyatlar-acqland-t84657.html
3. Алиев А. Природные битумы и горючие сланцы — альтернатива нефти. Информационный бюллетень «Нефть и газ» //Президентская Библиотека АР №1(5), 2010.С.10
4. М.К.Багиров. Комплексные методы воздействия на призабойную зону газо-нефтяных пластов. 1-е изд. Баку-2017, 176 стр. Издательство ГАНУН.
5. Удаление нефтепродуктов магнитной жидкостью из отходов / С.З. Калаева [и др.] // Экология и промышленность России. - 2003, дек. - С. 20-21.
6. Очистка сточных вод от нефтепродуктов с помощью магнитных жидкостей из отходов / С.З. Калаева, Н.А. Морозов, Ю.И. Страдомский, В.М. Макаров, А.М. Шипилин, И.Н. Захарова // Сб. матер. I Всерос. науч.-техн. Интертнет-конф. «Современные проблемы экологии и безопасности» : в 4 т. Т. III / под ред. Э.М. Соколова. - Тула : Из-во ТулГУ, 2005. - С. 28-29
7. Məlikov R.X., dissertasiya
8. Меликов Р.Х., Садыгова Т.Ю. “К вопросу повышения нефтеизвличения из битуминозных песков” АТМ№2, 2019





# RESULTS OF RESEARCH ON THE USE OF MAGNETIC FLUIDS IN THE PROCESS OF OIL REFINING FROM TAR SANDS

**Tarana Sadigova**
Assistant, Department of "Industrial Machines", Azerbaijan State Oil and Industry University, Azerbaijan.
E-mail: tarana_sadiqova@mail.ru

## ABSTRACT

Despite extensive theoretical research, scientific-practical and various engineering works in the field of separation of residual oil in bituminous sands, the problem remains relevant.
For this purpose, the article considers the issue of improving the process of separation of oil from bituminous sands under the influence of physical fields.
**Keywords:** Bituminous sands, ferromagnetic based fluids, magnetic and electric fields, oil yield factor.




# MƏNTİQ-LOGİSTİKA ALƏMİNDƏ KİMDİR BİRİNCİ

**Zakir Rüstəmov**
Professor, Azərbaycan Dövlət Dəniz Akademiyası, texnika elmlər doktoru, Azərbaycan. E-mail: rzao@mail.ru

## XÜLASƏ

Məqalədə, identik funksiyalı şəxslərdən yalnız birini görərək onun - "Logistik"in [1] tarixən IX-X əsrlərdə ilk dəfə yarandığını iddia edənlərdən fərqli olaraq, müəllif onları görür və digərinin (məntiqin-vəzirin) formalaşması faktının daha qədim (b.e.ə. 17-16 əsr) tarixi sənədlər ilə təsdiqləndiyinə iddia edir [2]. Nəticə etibarı ilə, ali kitablarda Tövrat, İncil, və Quranı Kərimdə əksini tapmış bizim eradan əvvəl 1864-1754-ci illərdə "Fironun yuxusunun yozulması" və ədəbi baxımdan "Yusif və Züleyxa" kimi daha çox hallandırılaraq formalaşan "hadisə" [3], müəllif tərəfindən iqtisadi-texniki baxımdan qənaətcil, hesablama məharətli və məntiqi düşünmə qabiliyyətli, yuxarıda qeyd olunmuş identik funksiyanın banisinin "Firon – Yusif peyğəmbər" olduğu sübut olunur.
**Açar sözlər:** logistik, məntiq, fitri istedad, təhlükəsiz, etibarlı, zəmanətli, tədarük, bölüşdürmə.

**Giriş:** Tədqiqata başlamazdan əvvəl qarşıya məqsəd qoyulmuşdur. Logistika nədir və görəsən bu planlı iş təhlükəsizlik və etibarlılıq nəzərə alınmadan təmin oluna bilər? Əgər təmin oluna bilərsə, onda nəqletmə logistikası yüklərin qorunmasında və çatdırılmasında müştəri qarşısında etibarlılıq və zəmanət məsuliyyətini necə təmin edə bilər? Bu baxımdan nəqliyyat vasitəsinin etibarlı istismarının daşınacaq yükün seçilməsi, toplanması, yük yeri üzrə mütənasib bölüşdürülməsi, yerləşdirilməsi, bərkidilməsi və nəqli logistik qurum tərəfindən planlaşdırıldığını və bu sistem altında həll olunmalı olduğunu əsas qəbul edərək məqsədə nail üçün məsələlərin həllini tədqiq-təklif edək.
Ədəbiyyatlarda müxtəlif yanaşma və açıqlama ilə "logistika" təhlil və təqdim olunsa da, bütün hallarda müəlliflər öz tədqiqatlarını əsaslandırmaq üçün obyektivliyi subyektivə çevirib fikir formalaşdırmağa üstünlük vermişlər. Logistika müxtəlif yanaşmalar ilə izah olunsa da məna və mahiyyətcə hamı eyni fikir üzərində durur.
**Əsas hissə:** Belə ki, bütün yanaşmalar Logistika sözünün kökünün qədim Yunan mənşəli olduğunu söyləyir: Log – düşünmək; Logos – dərrakə, dərk etmə; Logo – mülahizə, mülahizə yürütmə; Logistos – hesablamaq, fikir yürütmək, planlama; Logistikas - düşünmə məntiqliyi. Bəzi araşdırmalarda logistika kəlimə-kök etibarilə Latin dilində "lojik" (məntiq) və "static" (statistika) kəlmələrinin birləşməsindən meydana gəlmişdir ki, terminaloji məna olaraq "məntiqi statistika" sayılır [1,2,3,4].
Beləliklə "Logistika - müştərilərin ehtiyacını-tələblərini təmin və gəlir əldə etmək məqsədi naminə yük axınlarının, informasiyaların, maliyyənin və digər resursların idarə olunma sistemidir". Müştərilərin ehtiyacı - "müəyyən sayda və keyfiyyətdə sifariş edilmiş yüklərin az xərclə, təyinat məntəqəsinə dəqiq təyin olunmuş vaxtda çatdırmaq" kimi müəyyən edilir [4,5,6,7,8].
Beləliklə "logistika" açiqlamalarına çoxlu sayda misallar göstərmək mümkün olduğundan birbaşa aparılacaq tədqiqə keçək.

Bizim yanaşma bütün açıqlamaları inkar etmək deyil, lakin onlardan fərqli olaraq biz bir nəqliyyatçı-tədqiqatçı olaraq "logistika" açıqlamaları üzrə görülən işlərin və yanaşmaların hamısının bazasını təhlükəsizlik, etibarlılıq və zəmanətlilik təşkil etdiyini əsas qəbul edib müvafiq nəticələri formalaşdırmaq istəyirik.
Onda "Logistika" nədir, fərq etməz, mövcudlardan birinə bizim yanaşmadan baxaq:

**Logistika:** material (yük, əmtəə), insan və informasiya axınlarının optimal xərclər ilə təhlükəsiz, etibarlı, zəmanətli idarə olunmasıdır. Bundan belə logistikaya elmi yanaşmadan optimallılıq, praktiki yanaşmadan alət, menecment yanaşmadan strateji və s. terminləri əlavə olunmaq ilə ona izahlar vermək olar.
Tam qətiyyətlilik ilə söyləyə bilərik ki, logistikanın açıqlanmasında əsaslı olaraq təhlükəsizliyin, etibarlılığın və zəmanətliliyin işlənməsi ilk dəfə tərəfimizdən təklif olunmuşdur. Danılmaz fakt budur ki, təhlükəsizlik, etibarlılıq və zəmanət təmin olunmadan, logistik idarəetmənin mahiyyəti də olmaz.
Bəli, qeyd oluna bilər ki, təhlükəsizlik, etibarlılıq və zəmanətlilik olmayan yerdə nəqletmə logistikası və s. logistika ola bilməz. Onda, adekvat olaraq qeyd edə bilərik ki, məntiqsiz də idarə etmə ola bilməz. Daha doğrusu, hər hansı bir fəaliyyət növü ilə məntiqsiz məşğul olma, əhəmiyyətsiz sayıla bilməsinin söylənməsi də əsaslıdır.
Araşdırmaları davam etdirək, *"Logistika"* - yunan sözü olub ilk dəfə hərbi qüvvələrdə işlənmək ilə *"Hesablama məharəti"* mənasını daşımışdır.
İlk baxışdan *"Hesablama məharəti"* kəlməsi sadə görünə bilər. Qeyd edək ki, hərbidə arxa cəbhənin formalaşması, bununla da, ordunun ərzaq və sonralar sursat təminatı bütün mümkün maneələr və gözlənilən-gözlənilməyən fəsadlar nəzərə alınmaq ilə çatdırmanın təmini məqsədli hesablamalar aparılması tələb etmişdir. Onda, əsaslı olaraq qeyd edə bilərik ki, "logistik", yəni hesablama məharətlinə mənsub olan şəxs, yüksək məsuliyyət hissi ilə, nöqsana yol vermədən hesablamanı aparmaqla təhlükəsiz, etibarlı və zəmanətli çatdırmanı təmin etməlidir. Əks təqdirdə o dövrdə "logistik", saymağı bacaran hər bir şəxs qəbul olunardı. Deməli "logistik", sadə hesablama məharətinə malik olmamış, yüksək məntiqi biliklərə əsaslanaraq, yetkin bir fikri formalaşdırma və reallaşdırma qabiliyyətli şəxs olmuşdur.
Araşdırmanı davam etdirərək digər fakta nəzər salaq. Logistikanın şüarı – minimum xərclər, maksimum əhəmiyyətlilik – rasionallıq. Maraqlıdır az sərfiyat, yüksək rasionallıq, həyata keçirilməsi daha çətin. Qiymətsizdə - dəyərsizdə, qənaətcillik daha çətindir. Ona görə də nəqliyyat logistikası optimallığa üstünlük vermək ilə maksimum təhlükəsiz, etibarlı və zəmanətlilik çərçivəsində mümkün minimum xərclər ilə əhəmiyyətli – rasional daşımanın təminatlığı üzərində qurulmalıdır. Bu zaman optimallıq 3 əsas amil üzərində qurula bilər.

**Nəqliyyat növünün seçilməsi**: Bu zaman yük nə qədər ağır olarsa, o qədərdə yük vahidinə düşən xərclər az olar, qanunu qüvvəyə minir. Tonlarla yükün digər qitəyə nəqli dəfələrlə ucuz başa gəlir, nəinki 50 qr. çay qutusunun. Elə buna görə də vaxta qənaət etmədən su nəqliyyatı ilə yükün dövriyyəyə buraxılaraq daşınması daha səmərəli sayılır, nəinki, bahalı avtomobil və ya təyyarə daşımalar xidmətindən istifadə olunması.

**Həcm:** Daşımalarda xərclər smetasında təkrarlanaraq birindən - digərinə keçən, heç də az olmayan yükün sənədləşdirilməsi, mühasibat əməliyyatları, nəqliyyatın boşdayanmaları,




servis və s. xidmətlər üzrə xərclər məcmusu mövcuddur. Elə bu baxımdan yükün həcmi çox olduqca yük vahidinə düşən təkrarlanan xərclər sərfiyat azalar.

**Məsafə (marşrut):** Daşıma məsafəsi artdıqca yük vahidinə düşən xərc azalar. Elə bu səbəbdən də, bir yükün uzaq məsafəyə daşınması iki yükün qıssa məsafəyə daşınmasından daha sərfəlidir.

Beləliklə, logistika məntiqlikdə qızıl ortanın tapılması ilə, mütənasibliyi qorumaqla logistikadan – logistikaya sayıla bilər. Nəqliyyat logistikasında tam səmərəliliyi kiməsə əmin etmək düzgün sayılmır. Bu zaman daha məntiqi, daşımalarda təhlükəsizlik, etibarlılıq, zəmanətlilik, keyfiyyətlilik bir sözlə qarşılıqlı məmnunluğun təmini əsas faktor olmalıdır. Bununla da, nəticə olaraq təkidlə söyləyə bilərik ki, optimallıq, təhlükəsizlik, etibarlılıq və zəmanət logistikanın – məntiqi düşüncənin funksiyasıdır.

Geriyə qayıdaq. Logistik vəzifəsinin yaranma tarixinə nəzər saldıqda müxtəlif mənbələr onun IX-X əsrlərə təsadüf etdiyini söyləyir [1,4,5,6,].

Bizim apardığımız araşdirmalar isə məntiqi düşüncənin tarixinin çox qədim olduğunu söyləməyə əsas verir: ***Firon*** bir gecə yuxusunda ***"yeddi arıq inəyin, yeddi kök inəyi yediyini və yeddi yaşıl sünbül və yeddi quru sünbül görür"***.

Bizim eradan əvvəl XVII əsrdə Fironun yuxusunu məharətlə yozan Yusif Peyğəmbərin ağıllı, dərrakəli, fitri istedad sahibi və məntiqi düşünmə qabiliyyətinə malik olduğu çoxlarına və çoxdan bəlli idi. Məlum səbəblərdən (Yusif-Züleyxa) zindana salınmış Həzrəti Yusif, oradaca yuxunu yozaraq "yeddi il bolluq olacağını, arxasından gələn yeddi ilin isə qıtlıqla keçəcəyini" söyləyir. Beləliklə, bolluq dövründə qənaətcillik ilə cəmləmək (tədarük), qıtlıqda isə qənaətcillik ilə bölüşdürülərək paylanması problemi formalaşır. Əhali arasında məntiqi tədarük-bölgü aparılması məharətinin göstərilməsi məhz, zindandan təcili azad olunmuş, fitri istedadlı Yusif peyğəmbərə həvalə olunmaq ilə o, "Dövlət xəzinədarı", "Baş vəzir" bəlkə də kim bilir "dövlət logistiki" və ya "dövlət məntiqi" təyin olunur. Yusifin peyğəmbərin öz işinin öhdəsindən məharətlə gəlməsi "məntiqçinin" ("məntiqi yanaşmanın") - "logistikin" daha qədim dövrə aid olduğunu sübuta yetirir.

Diqqət yetirək eramızın əvvəllərində hərbidə "logistik" vəzifəsi yaradılır və ərzaq tədarükü-bölgüsü ilə məşğul olmaq ona tapşırılır. Eramızdan əvvəl XVII əsrdə də Yusif peyğəmbərə məhz ərzağın tədarükü - bölgüsü həvalə olunmuşdu. Hər iki halda ərzağın, məlum məsələdir tədarükü (cəmlənməsi), sonra isə bölgüsü ilə məşğul olunma, yəni eyni adlı ***vahid funksiya*** "məntiqi" düşünmə qabiliyyətli "hesablama" məharətli şəxsə tapşırılır. Təsadüfdür, yoxsa reallıqdır və hər iki halda ***vahid funksiya*** biri digərindən asılı olaraq formalaşır desək yanılmarıq ki? Məlum məsələdir ki, yox. Onda, onların vəzifə bölgüsünün eyni mahiyyət üzərində qurulması, hansısa əlaqənin olmasından xəbər verir söyləmək əsaslıdır.

Tarixən birinci tədarükçü-bölüşdürücü məntiqi düşünmə və hesablama məharətli şəxsiyyət (məntiqçi-logistik) olan Yusif Peyğəmbər haqqında "Tövrat", "İncil" və "Qurani Kərim"də qeyd olunur, ikinci "logistik" isə "Qurani Kərim" nazir olmasından çox-çox sonra yaranır. Bu zaman qətiyyətlə söyləmək olar ki, "məntiqçi" (rəsmən qeyd olunmasa da) vəzifəsi bizim eradan əvvəl XVII əsrdə yaranmış və ilk onun icrası üzrə şəxsiyyət Yusif peyğəmbər olmuşdur.

Yusif peyğəmbərin 7 il bolluq dövründəki taxıl tədarükünün, sünbüldə onların anbarlarda saxlanması (dövrünün yeni texnologiyası), sonrakı qırtlıq dövründəki bölüşdürülmə və

paylanması işinin icrası üzrə qoyulan məsələlərin həllinə nəzər saldıqda isə, hər bir görülən işin əsasının "qənaət" üzərində qurulduğunun şahidi oluruq.
Qənaət (ecanomy – in., эканомия - ru.) - israfçılığa yol verməmək, xərcləri optimallaşdırmaq, resurs istehlakının minimizasiyası ilə təsərrüfatın idarə olunması. Deməli iqtisadi-texniki logistikanın əsas prinsipi birinin bəhrələnməsi, digərinin isə mənfəət götürməməsi və ya müflisləşməsi üzərində qurulmamalıdır. Bu halda qarşılıqlı məmnunluq təmin olunmalıdır.
Bu gün, əhalinin maddi və mənəvi inkişafı naminə Dövlətçilik və xüsusiyyətçilik maraqlarının qorunması ilə qurulmuş bazar iqtisadiyyatı və sağlam rəqabət mühitində nəqliyyat məhsulunu müəyyənləşdirmək, yük axını zəncirini, nəql olunma zəncirini tədqiq etmək və nəql prosesinin iştirakçısına çevrilmək, fəaliyyət göstərərək və inkişaf etmək istəyində olan hər bir fiziki və ya hüquqi şəxs, qurum, şirkət yük axınının tədqiqi ilə bilavasitə məşğul olmağa məcburdur. Deməli fəaliyyət formasının və idarəetmə metodikasının logistika, məntiq əsaslarla qurulması və uzlaşmasının təmini bir çox hallarda şirkət strukturunda müvafiq bölmənin və ya logistik – məntiq əsaslara əsaslanaraq fəaliyyət göstərən rəhbər işçinin olması reallıqdır.
Yük axınlarını öyrənmək, onun nəqli prosesi zəncirinin qurulmasında iştirak etmək və ya bu zəncirin ayrılmaz hissəsinə çevrilmək nəqliyyatin idarəetmə strukturunda, tarixən çox qədim, zamanca nisbətən yeni sayılan, "logistika"ya müvafiq yerin verilməsi danılmazdır. Daşımaların təşkili və logistika, məntiq əsaslar üzərində icrası üçün aşağıdakılarin müvafiq ardıcıllıqla qurularaq məntiqi həlli vacib şərtlərdəndir.

1. Yük – nəqli tələb olunan yük-əmtəə.
2. Keyfiyyət – yükün keyfiyyət tələblərinə müvafiqliyi, nəqliyyat xassələri.
3. Miqdar – tələb olunan miqdara uyğunluğu.
4. Vaxt – planlaşdırılmış və ya çatdırılması tələb olunan vaxt.
5. Hara-kimə – çatdırılması tələb olunan yer, ünvan, kim.
6. Nəql xərci – minimum məsrəflər ilə reallaşdırılması.

Beləliklə, deyilənlərə istinad edilərək mütəxəssislər, logistik-məntiqi prinsipləri aşağıdakı interpretasiya kimi təsvir etməklə tədqiqatlar aparır, təhlil edirlər və icra mexanizminin zəncirini qururlar.




**Şəkil 1.** Logistik prinsiplərin interpretasiyası.

Ümumiləşdirərək qeyd etsək ki, nəqliyyat logistikasının funksiyası: 1) logistik məsələlərin həllini təhlükəsiz, etibarlı və zəmanətli təmin edən heyətin seçilməsi (yük axınlarının və nəqliyyat vasitəsinin idarə olunmasının təminatçıları); 2) çatdırmanı reallaşdıran təhlükəsiz, etibarlı və zəmanətli nəqliyyat vasitəsinin sinfi, növünün təyini; 3) təqdim olunan xidmətlər üzrə qiymət siyasətinin qurulması.




Bildiyimiz kimi, bu gün logistikanın əhatə dairəsi çox genişləndirilmişdir: hərbi logistika; biznes-logistika (və onun altında: tədarük logistikası, bölüşdürmə logistikası, realizə logistikası, nəqliyyat logistikası, gömrük logistikası, ehtiyatlar logistikası, anbar logistikası, informasiya logistikası və hətta məcmu (kompleks) logistika)); ekologiya logistikası; qənaətcillik logistikası; şəhər logistikası; məsələlər logistikası; provayder logistikası; muzey logistikası və s. [5,6,7,8].

Diqqət yetirək ki, bu gün praktiki və nəzəri olaraq "logistika" elmi istiqamət kimi ön plana keçirilərək bütün sahələri əhatə etmək ilə "inhisarçı" funksiyasını tam mənimsəməsi, sözün əsil mənasında ehtiyatlı olmağı əsla diktə edir. Bəli, elmdə çox gənc olan logistika, müasir elmi istiqamət olaraq, yeni nəsil alimlərin təşəbbüsü nəticəsində bütün sahələri özününkiləşdirməyə nail olmaqdadır. Əslində isə logistik-məntiqi düşünmə alimliyin, normal həyat tərzinin, idarəetmənin, fəaliyyətin funksiyasıdır. Məntiqsiz, düşüncəsiz, dərk etmədən "iş" ola, qurula bilməz. Elə bu baxımdan da çox keçməz ki, logistika öz əhatə dairəsinə qayıdaraq inhisarçılıqdan uzaqlaşmağa məcbur olacaq.

Bu gün dəbə minmiş hər hansı bir fəaliyyət sahə logistikasına nəzər salsaq görərik ki, o əmtəə, mal, informasiya, əmək resurslarını öyrənir, axın istiqamətlərini müəyyənləşdirir, optimal yerdəyişmələrini planlaşdırır, icrasını təşkil, təmin və nəzarət edir, yüksək etibarlı, zəmanətli və təhlükəsiz xidmət göstərir. Müəssisə, təşkilat, firma və s. qurumun fəaliyyətinin məcmu texnoloji proses zəncirinin bütün düyünlərinin hər birini ".......... logistika" adlandırmaqla işin məntiq üzərində qurulması kimi qəbul olunması, yəqin ki, nə zamansa məntiqsiz iş olmaz deyə reallığa qayıtma məcburiliyini formalaşdıracaq.

Bununla da biz inanırıq ki, inhisarçı logistika siyasətinə son qoyulacaq və fəaliyyət zəncirinin hər bir düyünü öz adı ilə adlandırılaraq iyerarxiya sistem çərçivəsində cəmiyyət, qurum, sədr, direktor, menecer, planlaşdırıcı (logistik), icraya qəbul edib iş bölgüsü aparan (koordinasiya mərkəzi), əlaqələndirici (agent), icranı təmin edici (stividor, operator və s.), nəzarətçi (dispetçer) və s. işçi qüvvələri funksiyalar estafetini ötürmək ilə idarəetmə texnoloji prosesini tamalayacaqlar. Logistika 1000 illərlə öncə necə tanınmışsa (tədarük-bölüşüdürmə-paylama), müasirlik nəzərə alınmaq ilə davam etdirilməsi reallıqdan yaranır və məcraya qayıtma təəccüb doğurmaz söyləmək əsaslıdır.

**Nəticə:** 1. Məntiqçinin - Logistikanın yaranma tarixi, mənbələrə istinad olunaraq VI-VII (IX – X) əsrlərə deyil, daha qədim "Firon" dövrünə, Yusif Peyğəmbər dövrünə təsadüf edir.
2. Qeyd olunanlar, logistikanın daha logistik (məntiqi) qəbul olunmasına, elmdə və həyatda qısqanclığa və biganəliyə yol verilməməsi üçün, logistika məfhumunu düzgün qiymətləndirərək bütün əlaqəli sahələri də, olduğu kimi görmək, qiymətləndirmək ilə logistika - "qızıl ortanın" işini digər bölmələr işi ilə əlaqəli qurmaq əsaslıdır.

## ƏDƏBİYYAT

1. Логистика — Википедия, https://ru.wikipedia.org/wiki/%D0%9B%D0%BE%D0%B3%D0%B8%D1%81%D1%82%D0%B8%D0%BA%D0%B0
2. Yusif peyğəmbər. https://ru.wikipedia.org/wiki/%D0%98%D0%BE%D1%81%D0%B8%D1%84_(%D1%81%D1%8B%D0%BD_%D0%98%D0%B0%D0%BA%D0%BE%D0%B2%D0%B0)
3. Yusif və Züleyxa. https://ru.wikipedia.org/wiki/%D0%AE%D1%81%D1%83%





D1%84_%D0%B8_%D0%97%D1%83%D0%BB%D0%B5%D0%B9%D1%85%D0%B0
4. Z.Ə.Rüstəmov, Daşımaların təşkili və Menecmenti. Dərslik. Bakı. Nəş. BXOR MMC. 2015. 220s.
5. Транспортная логистика. Учебник для транспортных вузов. Под ред. Л.В.Миротина. М:.2002, с. 512
6. Е. В. Панасенко. Логистика: персонал, технологии, практика. Москва: Инфра-Инженерия, 2011. С. 224.
7. Под ред. Б. А. Аникина, Т. А. Родкиной. Логистика. 2-е. М:. Из. Проспект, 2010. с. 406.
8. Степанов, Владимир Иванович. Логистика. Учебник для бакалавров. М:. Из. Проспект, 2013. с. 445..

## SOMEONE FIRST IN THE WORLD OF LOGIC-LOGISTICS

**Zakir Rustamov**
Professor, Azerbaijan State Marine Academy, Doctor of technical sciences, Azerbaijan. E-mail: rzao@mail.ru

## ABSTRACT

In the article, in contrast to those who consider only one of the two historical figures with identical functions and attribute the first mention of "Logistic" to the 9th-10th centuries. AD [1], the author, studying all the facts, claims that the formation of another personality (mantig-vizier), confirmed by historical documents, is more ancient and belongs to the 17-16 centuries. BC NS. [2]. Thus, based on the event, which is described in the holy books of the scriptures Torah, the Bible and the Koran and dated 1864-1754. "Interpretation of the Pharaoh's dream", and in the literary aspect, a more common work like "Yusuf and Zuleikha" [3], the author in the economic and technical aspect proves that the founder of the above identical functions - frugality, the art of calculation and logical thinking, is "Pharaoh - Prophet Yusuf"

**Keywords:** logistic, logic, talent, security, reliable, guaranteed, stocking (purchase), distributes.




# УПРАВЛЕНИЕ РИСКАМИ В МАГИСТРАЛЬНЫХ ГАЗОНЕФТЕТРУБОПРОВОДНЫХ СИСТЕМАХ ПРИ ВОЗМОЖНОСТНЫХ ОГРАНИЧЕНИЯХ НА ЗАТРАТЫ

**[1]Олег Дышин, [2]Ибрагим Габибов, [3]Джамаледдин Асланов, [4]Севда Агаммамадова**

[1]Старший научный сотрудник, НИИ «Геотехнологические проблемы нефти, газа и химия», к.ф-м.н, доцент, Азербайджан.
[2]Профессор, Азербайджанский Государственный Университет Нефти и Промышленности, д.т.н, Азербайджан. https://orcid.org/0000-0003-3393-78123
[3]Доцент, Азербайджанский Государственный Университет Нефти и Промышленности, д.ф.т.н, Азербайджан.
[4]Доцент, Азербайджанский Государственный Университет Нефти и Промышленности,д.ф.т.н, Азербайджан.
E-mail: [1]h.ibo@mail.ru; [3]tribo72@mail.ru

## РЕЗЮМЕ

Задача управления технико-технологическими рисками в магистральных газонефтетрубопроводных системах при условии возможностных ограничений средств, выделенных на предотвращение и ликвидацию последствий аварий, рассмотрена в виде полумарковской модели принятия решений для управляемого марковского процесса в непрерывном времени с критерием максимума среднего дохода с дисконтированием. Для нахождения оптимальной нерандомизированной марковской стационарной стратегии предложена процедура, основанная на сведении поставленной нечеткой задачи к эквивалентной задаче булевого программирования с детерминированными ограничениями. Для решения полученной системы ограничений неравенств разработан алгоритм нахождения базисных решений при произвольном числе аварий и мероприятий по их ликвидации.
Численная реализация предложенного подхода реализована для реальной задачи управления рисками в магистральном газопроводе при нечетких ограничениях средств на затраты.
**Ключевые слова:** полумарковский процесс принятия решений, марковская стационарная стратегия, возможностная оптимизация, базисные решения неравенств.

**Введение.** Управление рисками – это неотъемлемая часть любой предпринимательной деятельности, состоящая из целей и соответствующих им управленческих решений принятия, планирования и контроля за ресурсами. В условиях глобальной экономики повышение финансовой стабильности компании и минимизации потерь от рисков становятся для нее одними из ключевых задач [1].
Существует несколько основных групп событий, которые оказывают непосредственное влияние на уровень риска эксплуатации магистральной газонефтетрубопроводной системы (МГНТС): I – политическая, II – экономическая, III – технико-технологическая, IV – экологическая.

Наибольший удельный вес имеет III группа события, в которой наибольшее число отказов, потенциально зависящих от множества факторов, в том числе человеческого. Нами рассматривается только III группа событий.
Проблема принятия решений занимает одно из доминирующих мест в теории анализа и оптимизации процессов функционирования объектов и систем. Она приобретает особо актуальное значение для организации функционирования систем в условиях неопределенности. В таких условиях возникают принципиальные трудности в формировании и описании множества альтернатив, из которого должна быть выбрана наилучшая, а также трудности в формулировании и обосновании принципа оптимальности выбора наилучшей альтернативы. Таким образом, проблема принятия решения должна быть формально – математически поставлена и решена, когда принцип выбора не формализован.
В сложных системах, к которым относится МГНТС, формальная постановка задачи оптимизации не просто затруднена, но и в целом ряде случаев основные системные параметры являются нечеткими, а стохастические характеристики для них определить не представляется возможным. К тому же в системах имеются неконтролируемые возмущающие факторы, приводящие к изменению структуры системы, к нарушению ее устойчивости.
Исследование проблемы принятия решений в нечеткой среде стало возможным благодаря работе Р.Белмана и Л.Заде [2]. В ней была предложена симметричная схема для принятия решений, в соответствии с которой не делается различий между целями и ограничениями задачи. Они моделируются соответствующими подмножествами числовой прямой.
В работе [3] Л.Заде обновил теорию нечеткости, положив начало теории возможностей. Следствием этого явилось рассмотрение задач нечеткой оптимизации в контексте теории возможностей. Однако анализ этой работы показывает, что в задачах нечеткой оптимизации лишь изменено название функций принадлежности на распределение возможностей, а аппарат исследования проблемы остается прежним: исчисление нечеткости, основанное на принципе обобщения. Однако теория возможностей имеет под собой более глубокую математическую основу – меру неопределенности. Одной из этих мер является мера возможности (possibility measure) [4].
Использование аксиоматики теории возможностей для построения моделей оптимизации в условиях неопределенности позволяет рассматривать эту проблему с общих позиций мер неопределенности. Такой подход позволяет избежать неструктурированности при построении формальной оптимизационной модели принятия решения, вскрыть ее внутреннюю и внешнюю структуру, установить связь между нечеткими, стохастическими и интервальными моделями. Теоретическое обоснование и разработка класса базовых моделей и проблем нечеткой оптимизации на базе современной теории возможностей даны в работе [5]. Суть возможностного подхода к проблеме нечеткой оптимизации не только в интерпретации нечеткости как возможности, а в систематическом применении аксиоматической теории возможностей как математического аппарата исследования проблемы.
В настоящей работе рассматривается задача управления рисками в МГНТС при ограниченных объемах средств, выделенных на мероприятия по предупреждению или ликвидацию последствий аварий, и известных функциях распределения времени




безотказной работы между соседними авариями определенного типа и функциях распределения времени восстановления работоспособности, с использованием каждого решения из заданного комплекса мероприятий при авариях определенного типа. Задача формулируется в виде полумарковской модели принятия решений для управляемого марковского процесса в непрерывном времени с нелинейной целевой функцией дохода и возможностными ограничениями на затраты каждого вида средств, выделяемых на определенный тип аварий.

С помощью возможностного подхода к задаче нечеткой оптимизации и максимизации уровня при построчных ограничениях по ожидаемой возможности, сформулированная задача сводится к эквивалентной детерминированной задаче нелинейного программирования с булевыми переменными. В случае четких коэффициентов линейных ограничений данная задача решена в работе [6].

**Постановка задачи:** Пусть каждому состоянию $i \in S$, $S=\{0, 1, 2, \ldots, N\}$, рассматриваемой МГНТС поставлено в соответствие конечное множество $K_i$, решений (различные комплексы мероприятий в случае аварий и поддержка режима нормального функционирования при отсутствии аварий), элементы которого обозначим $k=1, 2, \ldots, k_i$. Если система находится в состоянии $i \in S$ и принимается решение $k \in K_i$, то ее дальнейшее поведение определяется вероятностным законом

$$Q_i^{(k)}(t) = p_{ij}^{(k)} F_{ij}^{(k)}(t), \quad j \in S, \tag{1}$$

где $p_{ij}^{(k)}$– вероятность перехода системы в состояние $i$; $F_{ij}^{(k)}(t)$ – функция распределения времени пребывания системы в состоянии $i$ при принятии решения $k$ и при условии, что следующий переход произойдет в состояние $j$.

Будем полагать выполненными следующие условия:

1. Состояние $i=0$ соответствует нормальному функционированию, а $i \neq 0$ – аварийным (или предаварийным) ситуациям.

2. Функции $F_{0j}^{(k)}(t)$ и $F_{j0}^{(k)}(t)$ , $j \in \tilde{S} = S \setminus \{0\}, k \in K_j$ вместе со своими первыми производными непрерывны при $t>0$, за исключением, быть может, конечного числа точек, и возрастают на бесконечности не быстрее экспоненциальной функции, что обеспечивает существование для этих функций интеграла Лапласа-Стилтьеса.

3. За единицу времени пребывания в состоянии $i$ в случае принятия решения $k$ выплачивается средний доход $r_i^{(k)}$ (при $i \neq 0$ число $r_i^{(k)}$ отрицательно и равно средним издержкам системы за единицу времени пребывания в состоянии $i$ при условии выхода из этого состояния с использованием решения $k$).

4. Величины $|r_i^{(k)}|$ ограничены при всех $i \in S$, $k \in K_i$ и вероятности $p_{ij}^{(k)}$ удовлетворяют соотношениям

$$\sum_{j \in S} p_{ij}^{(k)} = 1, \ \ i \in S, \ \ k \in K_i, \ \ \ p_{ij}^{(k)} \geq 0, \ \ i, j \in S, \ \ k \in K_i \tag{2}$$

